*© "Metafizika" Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 2, serial 22, 2023. pp.61-69* *e-ISSN 2617-751X*

**UOT:** 1 (091).
**KBT:** 60.03
**MJ №** 170

# XIX əsrdə Azərbaycanda milli şüurun formalaşmasında Həsən bəy Zərdabinin fəlsəfi ideyalarının rolu

**Rafail Əhmədli***

**Abstrakt.** Məqalədə XIX əsrin əvvəlləri Azərbaycanın ictimai-siyasi mühiti, xalqın böhranlı vəziyyətindən çıxış yolu axtaran, millətin maariflənməsi, milli özünüdərk və siyasi şüurunun inkişafında misilsiz xidməti olan Həsən bəy Zərdabinin fəaliyyəti araşdırılmışdır. Bu istiqamətdə onun milli ideyaları meydana çıxarmaq üçün daha əlverişli bir vasitəni - mətbuatı seçməsi, millətinin oyanışı, milli və dini birlik ideyasının yayılması baxımından zehni və əməli fəaliyyəti nəzərdən keçirilir.

Eyni zamanda, Həsən bəy Zərdabinin xalqının milli şüurunun oyanışına verdiyi töhfə, milli düşüncə sahiblərini milli problemlər ətrafında düşünməyə, millətin dərdlərini mətbuat vasitəsilə bölüşməyə səfərbər etməsi qeyd olunaraq, onun ümumi fəlsəfi baxışları, aləmin dərk olunması istiqamətində düşüncələri araşdırılır.

**Açar sözlər:** Milli şüur, milli özünüdərk, maarifçilik, elm, düşüncə, mətbuat

## 1.Giriş

XIX əsrin əvvəlləri Azərbaycanda rus işğalları başladıqdan sonra çarizmin əsas məqsədlərindən biri xalqı dilindən, dinindən, milli-mənəvi dəyərlərindən ayırmaq, onu assimilyasiyaya uğratmaq idi. Bu dövrdə Azərbaycan xalqı özünün tənəzzül dövrünü yaşayır, din və şəriətə aid bilgilər mahiyyəti üzrə deyil, dövrün siyasi durumuna müvafiq şəkildə təbliğ edilirdi. Mövcud böhran vəziyyətindən çıxış yolunu Azərbaycan mütəfəkkirləri xalqın maariflənməsində, milli özünüdərkində və siyasi şüurunun inkişafında görürdülər. Belə mütəfəkkirlərimizdən biri də Həsən bəy Zərdabi idi.

* Fəlsəfə elmləri doktoru, professor,
Azərbaycan Dövlət Pedaqoji Universiteti, "Fəlsəfə və sosial elmlər" kafedrasının müdiri; Bakı, Azərbaycan
E-mail: ehmedli.rafail@mail.ru
https://orcid.org/0000-0003-0506-3353

**Məqaləyə istinad:** Əhmədli, R. [2023] XIX əsrdə Azərbaycanda milli şüurun formalaşmasında Həsən bəy Zərdabinin fəlsəfi ideyalarının rolu. *"Metafizika" jurnalı. 6(2),* səh. 61-69.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 04.04.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 08.05.2023*
*Çapa qəbul edilmişdir: 06.06.2023*

Bir maarifçi filosof olan Həsən bəy xalqı dövrün dini dünyagörüşündən imtina etməyə, ağıla üstünlük verməyə səsləyir, rasional əsasları olmayan dini doqmaları kor-koranə inanc olaraq qəbul edən ortodoksal dini dünyagörüşləri tənqid edir və göstərirdi ki, insan yaranışından ağıllı və xeyirxahdır. Onu qəzəbli və xəbis xislətli edən qeyri-kamil sosial mühit və münasibətlər olmuşdur. Mütəfəkkir üçün ağıl və dərrakə bütün mövcudiyyətin yeganə ölçü meyarı idi. Filosof bu məqsədlə ictimai inkişaf naminə elmi nailiyyətlərin praktik tətbiqinə önəm verirdi.

**2.Həsən bəy Zərdabinin yaradıcılığında maarifin və elmin yeri**

Azərbaycan xalqının milli şüurunun formalaşmasında sözün əsl mənasında xalq fədaisi Həsən bəy Zərdabinin maarifçilik fəlsəfəsinin mühüm rolu olmuşdur. Azərbaycan tarixinə ilk türkdilli qəzet və milli teatr yaradan şəxsiyyət kimi daxil olan Həsən bəy Zərdabi mənsub olduğu xalqın inkişafını ilk növbədə maariflənmədə görmüş və bu arzularını həyata keçirmək üçün çox əzablı və məşəqqətli bir həyat yolu keçərək mövhumat və cəhalətə qarşı elmi və maarifi mübarizə yolu kimi seçmişdi.

Ömrünün 40 ildən artıq bir dövrü ərzində mənsub olduğu xalqının səadəti və tərəqqisi uğrunda yorulmaq bilmədən əzmlə mübarizə aparan, həyatının mənasını xalqın yüksəlişində görən Zərdabi, bu böyük mübariz xalq fədaisi, öz qarşısında Azərbaycan xalqını cəhalət və avamlıqdan xilas etmək kimi nəcib bir məqsəd qoymuş və bunun üçün maarifi əsas vasitə seçmişdi. Parlaq ideyaya, mükəmməl biliyə, geniş dünyagörüşə malik olan Həsən bəy Zərdabinin tükənməz irsi, milli məfkurə, sivil, mədəni quruculuq qaynağı və xalqın milli şüurunun formalaşması kimi, müxtəlif elm sahələrində çalışan tədqiqatçıları- filosofları, iqtisadçıları, jurnalistləri, filoloqları daim maraqlandırmış, bir sıra tədqiqat əsərlərində onun ictimai-siyasi mövqeyi, fəlsəfi və təbii elmi görüşləri, cəmiyyətə münasibəti işıqlandırılmışdı.

Tədqiqatçılar göstərirlər ki, milli şüurun oyanışı millətin öz əzmini, kökünü, tarixini tanıması məsələsi ilə sıx bağlıdır. XIX əsrin sonlarına doğru Həsən bəy Zərdabinin simasında milli mətbuatın yaranması ilə maarifçilik və milli özünüdərk prosesinin yeni mərhələsi başlamışdı. Həsən bəy Zərdabinin milli şüurun oyanışına verdiyi bu töhfə vasitəsilə, əslində xalqın inkişafında yeni eranın başlanğıcı qoyulmuş, milli və ictimai məsələlər minlərlə azərbaycanlının fikrinə və duyğularına hakim kəsilir. Zərdabinin çağdaşlarından başlıca üstünlüyü də, milli ideyaları ortaya qoymaq üçün daha əlverişli bir vasitəni- mətbuatı seçməsi idi. Çünki mətbuat xalqın kütləvi şəkildə maariflənməsi, Türk millətinin oyanışı, milli və dini birlik ideyasının yayılması baxımından çox önəmli idi. Ən vacib məqam o idi ki, "Əkinçi" köhnəpərəstlərə qarşı bütöv bir "Vətənsevərlər cəbhəsi" yaratdı. Artıq

Azərbaycan ziyalıları Bakıxanov, Mirzə Şəfi Vazeh, Mirzə Fətəli Axundov kimi tək-tək deyil, sxolastik dünyagörüşünə və mühafizəkarlığa qarşı, müəyyən mənada, bir mövqedən mübarizə aparmağa başlamışdılar. Bu baxımdan Zərdabi yalnız milli mətbuatın banisi deyil, həm də milli ideologiya əsasında 1918-ci ildə yaranan Azərbaycan Cümhuriyyətinin qurucuları olanların da ideoloqudur [Ömərov, s.13].

Zərdabi yaratdığı “Xeyriyyə” cəmiyyətlərinin, teatrın xalqın maariflənməsinə nail olmadığını görüb yeni imkanlar axtarmış və sonda belə bir nəticəyə gəlmişdi ki, bu işi yalnız Türk dilində olan bir mətbu orqanı illə həyata keçirmək olar. Bu barədə Həsən bəy Zərdabi özünün “Rusiyada əvvəlinci Türk qəzetəsi” adlı məqaləsində yazırdı:

> *“Bizim sabiq “Cəmiyyəti-xeyriyyə” bina tutmadığından, teatr oynanan otaq boş qaldığından aşkar oldu ki, müsəlman qardaşlarımızı bir yerə cəlb edib zamanəyə müvafiq məktəbxanələr açdırıb küçə və bazarlarda qalan uşaqları oxutmaq olmayacaq. Elmsiz də bu zəmanədə dolanmaq mümkün deyil... Belədə nə qayırmalı? Hər kəsi çağırıram gəlməyir, deyirəm qanmayır. Axırda gördüm ki, onları haraylayıb çağırmaqdan, onlara deməkdən başqa bir qeyri-əlac yoxdur. Olmaz ki, mənim sözümü eşidənlərdən heç bir qanan olmasın. Necə ki, bir bulağın suyunun altına nə qədər bərk daş qoysan, bir neçə ildən sonra su tökülməkdən o bərk daş mürur ilə əriyib deşilir, habelə söz də. Ələlxüsus doğru söz... Belə də qəzet çıxarmaqdan savayı bir qeyri-əlac yoxdur... Heç olmaz ki, doğru söz yerdə qalsın. Hər eldə on qəzet oxuyandan birisi oxuduğunu qansa, onların qədəri ilbəil artar... Sonra düşmənin düşmənliyi, dostun dostluğu və dost göstərən doğru yolun olması aşkar olar”* [Zərdabi. 1905. “Həyat” qəzeti, 28 dekabr, № 129].

Doğrudur, Həsən bəy Zərdabi fəlsəfi məsələlərlə bilavasitə məşğul olmamış və fəlsəfəyə dair xüsusi bir elmi əsər yazmamışdır. Lakin onun ayrı-ayrı yazılarında olduqca maraqlı və qiymətli fəlsəfi ümumiləşdirmələr və nəticələr öz əksini tapmışdır. Zərdabi yaşadığı dövrdə baş verən ictimai-siyasi, fəlsəfi, elmi, mədəni, texniki hadisələri öz yazılarında əks etdirmiş, bu yazılarda çar üsul-idarəsinin tənqidinə, baş verməkdə olan fəhlə hərəkatının, sosial münaqişələrin təsvirinə, milli azadlıq hərəkatının işıqlandırılmasına xüsusi yer vermişdir.

Zərdabi öz yazılarında elmə, elmi biliklərin tətbiqinə geniş yer vermiş, hər şeyin çarəsinin elmdə olduğunu irəli sürmüş, insan şüurunun inkişafı ilə elmi biliklərin mənimsənilməsi prosesi arasında dialektik əlaqəyə ciddi əhəmiyyət vermişdi. O, qədim dövr filosoflarının fikrinə istinad edərək göstərirdi ki, insan da heyvandır, lakin şüuru artıq olma səbəbinə bütün heyvanların

padşahıdır, tamam məxluqatın ən alisidir. İnsan fiziki-bioloji imkanları etibarilə digər heyvanlardan çox geri qalsa da, elmi biliklərə sahib olması nəticəsində xariqələr yaradır, hər cür heyvanata faiq (üstün - R.Ə.) gəlir.

*"İnsan əql ilə hər şeyin səbəbini axtarıb və bu tövr ilə elmlər bina edib su ilə maşınlar, külək ilə dəyirman, su buğu ilə ataş ərəbəsi (gəmisi) və qeyrə iştədib hətta göydə olan günün istisi ilə maşınlar bina edir. Pəs əql və elmlə insan tamam dünyanı təsəvvür edə bilər... Lakin insan bu şərafətdən (heysiyyətdən - R.Ə.) özünü uzaq edib... Heyvan haraya istəsə gedir, hər tərəfə istəsə baxır, nə istəsə eləyir, haçan kefi istəsə ulayır. Amma insan nəinki öz istədiyini deyə bilmir, hətta heyvan kimi öz xahişi ilə danışa da bilməyir. Pəs (bu halda - R.Ə.) insanın maliki-dünya hüququ paymal (məhv) olub. Onun əqli pəs təvanələr (bu halda güc) üçün işləyir"* ["Əkinçi", 1875-1877. № 4. Tam mətni: "Avrasiya press", 2005. Bakı].

Zərdabinin bu fikirlərini dəyərləndirən tədqiqatçılar göstərirlər ki, Həsən bəy Zərdabi elmdən, maarifdən danışarkən insanların diqqətini onların o zamankı cəmiyyətdə tutduğu miskin, kölə vəziyyətinə yönəldir, sanki onu öz kölə vəziyyəti ilə barışmamağa, "üsyana" çağırır [Rüstəmov. 2012. s.138].

Zərdabi "Zindəganlıq davası" (Həyat mübarizəsi - R.Ə.) haqqında yazırdı "Zikr olan zindəganlıq cəngində tüfəng və xəncər işləməz, güc və rəşidlik (İgidlik - R.Ə.) iş görməz. Onun əsbabı (aləti - R.Ə.) ancaq əqldir və əql bir şeydir ki, işləndikcə tərəqqi edər, yəni elm təhsil etdikcə, əql də artar" [Rüstəmov. 2012. s.138].

Zərdabi dövrün ziyalılarına müraciət edərək yazırdı: *"Millət, dövlət qeyrəti çəkən qardaşlar, gərək xəyaləti-qəvaidi-mövhumiyyəni kənara qoyub, bacarıq və qüvvə sahibləri əsbab, aləti-tərəqiyyat və məktəbxanələr bina edin"*[Rüstəmov. 2012. s.139].

Zərdabi çar Rusiyasında Azərbaycan Türkcəsində çıxan yeganə qəzetin məqsəd və vəzifələrini işıqlandıraraq yazırdı: "Əkinçi" - müəllim deməkdir. O yalnız xalqın xeyrini düşünür. O deyir: Xalq arasına bacarıq, bilik və elm toxumu səpin ki, öz xalqınızı ucaldasınız. "Əkinçi" bir vaizdir ki, bizi əbdandarlıq elmlərinə vəz və təhrik edir... "Əkinçi bir aynadır ki, bizə zillət və məskənət eyiblərini nümayan edir və izzət və tərəqqi hüsnlərin cilvəyə verir ki, bəlkə nə qədər ki, kök sudadır, səmərə ümidi var ki, əməlimizin hüsnü qüthün dərk edib onun çarəsin fikr edək" ["Əkinçi", 1875-1877. № 1 Tam mətni: "Avrasiya press", Bakı, 2005].

**3.Həsən bəy Zərdabinin fəlsəfi düşüncələrinin milli şüurun inkişafına təsiri**

Doğrudur, Həsən bəy Zərdabi fəlsəfi məsələlərlə bilavasitə məşğul olmamış və fəlsəfəyə dair xüsusi bir elmi əsər yazmamışdır. Lakin onun ayrı-

ayrı yazılarında olduqca maraqlı və qiymətli fəlsəfi ümumiləşdirmələr və nəticələr öz əksini tapmışdır. Zərdabi yaşadığı dövrdə baş verən ictimai-siyasi, fəlsəfi, elmi, mədəni, texniki hadisələri öz yazılarında əks etdirmiş, bu yazılarda çar üsul-idarəsinin tənqidinə, baş verməkdə olan fəhlə hərəkatının, sosial münaqişələrin təsvirinə, milli azadlıq hərəkatının işıqlandırılmasına xüsusi yer vermişdir.

Zərdabi xalqın qəflət yuxusundan oyanması, onun xoşbəxt gələcəyi uğrunda mübarizədə yüksək məqsəd və vəzifələri göstərərək yazırdı: “Dünya bir şeydir ki, həmişə dövran edir və insan bu tövr dünyanın gərdisinə görə gərək habelə öz rəftarını da dəyişsin, necə ki, məsəldir, deyirlər, zəmanə sənə saz olmasa, sən zəmanəyə saz olginən. Pəs olmaz ki, dünyada həmişə bir qayda ilə rəftar olsun. Bizim zəmanənin dəyişilməyi, əlbəttə, hər anlıyan kəsə məlumdur və bu tövr zəmanənin dəyişilməyi bizim ilə deyil, həmçinin biz qadir deyilik ki, zəmanəni dəyişilməkdən saxlayaq. Ol kəslər ki, həmişə bizə etibar edib bizim sözlərimizə əməl ediblər, zəmanə dəyişildiyinə görə gün-gündən tərəqqi edib irəli gedirlər. Onların belə irəli getməyinə mane olmaq, yəni onların keçən zəmanənin qaydası üzrə saxlamaq məsləhət deyil, ona görə ki, yolu onlar bizsiz də gedəcəkdilər. Pəs bizim anlıyan və pişrov (qabaqcıl - R.Ə.) kəslərə eyni məsləhətdir bu yolu onlar ilə elə bir yerdə getsinlər, ta ki, onların tez tərəqqi etməyinə səbəb olsunlar və buna görə gələcəkdə həmçinin onlara pişrov (irəlidə gedən R.Ə.) olsunlar” [“Əkinçi”, 1875-1877. Tam mətni: “Avrasiya press”, Bakı. 2005. s.24-25].

Zərdabinin Azərbaycan xalqının milli şüurunun oyanışına verdiyi töhfə əslində, xalqın inkişafında yeni eranın başlandığından xəbər verməklə milli düşüncə sahiblərini milli problemlər ətrafında düşünməyə, millətin dərdlərini mətbuat vasitəsilə bölüşməyə səfərbər edirdi. Milliliyin inkişafında kütləviliyin oynadığı rol haqqında Yaşar Qarayev yazır: “Milli özünüdərkin, etnik şüur intibahının fəlsəfədə, elmdə ideya ifadəsidir. Lakin bu ideya, bu fəlsəfə də nəzəriyyədən təcrübəyə, milli ideyadan milli şüura tam halda yalnız o zaman çevrilir ki, ayrı-ayrı ziyalılar, təklər yox, kütlələr əməldə, işdə ona sahiblik şüuru nümayiş etdirirlər” [Ömərov. 2012. s.13].

Həsən bəy Zərdabinin peşəkar və ardıcıl tədqiqatçısı professor İzzət Rüstəmov “Həsən bəy Zərdabi” adlı monoqrafiyasında mütəfəkkirin fəlsəfi görüşlərindən bəhs edərkən göstərir ki, Zərdabi Yerin və Günəş sisteminin yaranması, insanın yaranması haqqında öz dövrü üçün olduqca mühüm əhəmiyyət kəsb edən fikirlər irəli sürmüş, insanı bütün canlıların əşrəfi adlandırmışdır. O, Yerin yaranmasını Günəş sistemindən kənarda götürmür və dönə-dönə vurğulayırdı ki, Günəş sisteminin bir Planeti olan və fəzada hərəkət edən Yer ümumi Kainatın bir hissəsi olmaqla onun inkişafı ilə sıx

bağlıdır. Zərdabinin fikrincə, Yerin əmələ gəlməsi bütün Kainatın inkişafının bir anıdır. Zərdabi bitkilər, heyvanlar və insanın meydana gəlməsində ümumi bir mənşəyin olduğu fikrini söyləsə də, o, insanı heyvanlarla eyniləşdirməmişdir. Zərdabiyə görə, insan mənşə etibarilə heyvanlar aləminə daxil olsa da, o, öz şüuru və əmək alətlərindən istifadə etmək qabiliyyətinə görə bütün canlılar aləminin padşahıdır [Əsgərov. Modern.az saytı, 2 yanvar 2013].

Zərdabi "Sümük, ət, beyin" adlı məqaləsində şüurun əmələ gəlməsinin fizioloji əsaslarını göstərərək qeyd edir ki, beyin öz-özlüyündə şüur hazırlaya bilməz. Beyin xarici aləmdən ayrılıqda götürüldükdə nə mövcud ola bilər, nə də şüur orqan kimi çıxış edə bilər. Şüur xarici aləmin insan beynində inikası olduğuna görə, o yalnız xarici mühitin insanın hiss üzvlərinə təsiri nəticəsində yarana bilər. O, şüurun sayəsində insanların bütün canlıların padşahı olmasını insanlar üçün böyük şərafət adlandırır və bu tezisdən ictimai həyata istiqamətlənmiş kəskin nəticə çıxarır. Zərdabi, insanların təbii hüquq və şərafətini, cəmiyyətdə tutduqları miskin və acınacaqlı həyatla qarşılaşdırır, bununla da onları öz təbii hüquq və insaniyyət şərafətini bərpa etmək uğrunda mübarizəyə çağırırdı [Əsgərov. Modern.az saytı, 2 yanvar 2013].

Mütəfəkkirin idrakla bağlı düşüncələri tam sistem xarakteri daşımasa da, onun dünya və onun qanunauyğunluqlarının dərk edilməsi, idrakın obyektivliyi, idrak prosesində hissi və rasional cəhətlərin vəhdəti, xarici aləmin insan beynində düzgün inikası haqqında olan fikir və mülahizələri indi də öz aktuallığını saxlamaqdadır. Filosof idrakın hissi və mücərrəd təfəkkür mərhələlərini göstərməklə belə bir fikir irəli sürür ki, hissi idrakda mücərrəd təfəkkür və idrakın mücərrəd təfəkkür mərhələsində hissi idrak iştirak edir. Müəllif idrakla empirik və rasional cəhətləri vəhdətdə götürür və onları bir-birindən ayırmırdı. O, göstərirdi ki, insan idrakı hadisələrin yalnız zahiri əlamətləri ilə kifayətlənə bilməz. O, mütləq hadisələrin mahiyyətinə varmalıdır. Filosofa görə, hadisə yalnız fikir və düşüncə üçün predmet verir. Mahiyyət dərində olduğundan onun aşkara çıxarılması üçün böyük səy və axtarış gərəkdir. Zərdabiyə görə, hadisə mahiyyətin ifadəsi, onun aşkara çıxmasıdır. Hadisə predmetin mahiyyətini tam əks etdirmədiyindən onun haqqında bütün təsnifatı ilə məlumat vermir, bu məlumatların həqiqətə çevrilməsi üçün hadisə dərindən öyrənilməli və onun mahiyyəti aşkara çıxarılmalıdır [Əsgərov. Modern.az saytı, 2 yanvar 2013].

Daima Azərbaycan kəndlilərinin ağır vəziyyətdə olduqlarını qələmə alan Zərdabi "Kaspi" qəzetinin bir neçə sayında "Kəndin xeyirxahları" adlı məqalə dərc etdirmiş, bu məqalələrdə o zaman ikiqat zülm altında - bir tərəfdən çar müstəmləkəçilərinin, digər tərəfdən bəylərin, xanların və

ağaların zülmü altında olan Azərbaycan kəndlilərinin ağır vəziyyətini təsvir edərək yazırdı: *“Vergilərin belə bölündüyü halda həmişə əyriliklər olacaq. Bizim kəndlilər öz müftəxor qolçomaqlarından asılı olduqca, sözün əsil mənasında, azad vətəndaşlara çevrilməyincə o əyriliklər də mövcud olacaq”* [“Kaspi” qəzeti, 23 yanvar 1900, № 18].

**4.Nəticə**

Yekun olaraq demək olar ki, mütəfəkkirin fəlsəfi dünyagörüşündə vətənpərvərlik, öz xalqının rifahı və xoşbəxtliyi uğrunda mübarizə ideyaları mühüm yer tutduğundan Azərbaycan xalqının milli şüurunun formalaşmasında əsaslı rol oynamış, özündən sonra gələn Azərbaycan ziyalıları və böyük mütəfəkkirləri üçün bir mayaka, örnəyə çevrilmişdir. Haqlı olaraq Həsən bəy Zərdabini görkəmli ideoloqlar Azərbaycan Xalq Cümhuriyyətinin yaradıcılarının ideya mənbəyi hesab edirlər.

## ƏDƏBİYYAT

1. *“Əkinçi”, 1875-1877.* Tam mətni, “Avrasiya press”, Bakı, 2005.
2. Əsgərov, R. (2013). *İzzət Rüstəmovun “Həsən bəy Zərdabi” monoqrafiyası haqqında.* Modern Az saytı, 2 yanvar.
3. Həsən bəy Zərdabi. (1905). *Rusiyada əvvəlinci Türk qəzetəsi*. “Həyat” qəzeti, 28 dekabr, № 129.
4. “Kaspi” qəzeti, 23 yanvar, 1900-cü il, № 18.
5. Ömərov, V. (2012). *Həsən bəy Zərdabi və azərbaycançılıq*. “Səs” qəzeti, 7 mart.
6. Rüstəmov, İ. (2012). Seçilmiş əsərləri. *Zərdabi irsinin şah əsəri - “Əkinçi” adlı məqaləsindən götürülmüşdür*. Bakı, 2012.

## Роль философских идей Гасан бека Зардаби в формировании национального самосознания Азербайджана XIX века

**Рафаил Ахмедли***

**Абстракт.** В статье рассматривается общественно-политическая обстановка в начале XIX века в Азербайджане, кризисное положение

* Доктор философских наук, профессор,
Ведущий научный сотрудник Института Философии и Социологии НАНА; Баку, Азербайджан
E-mail: ehmedli.rafail@mail.ru
https://orcid.org/0000-0003-0506-3353

**Цитировать статью:** Ахмедли, Р. [2023]. Роль философских идей Гасан бека Зардаби в формировании национального самосознания Азербайджана XIX века. *Журнал «Metafizika». 6(2),* с.61-69.

**История статьи:**
*Статья поступила в редакцию: 04.04.2023*
*Отправлена на доработку: 08.05.2023*
*Принята для печати: 06.06.2023*

народа и деятельность Гасан-бека Зардаби, искавшего выход из создавшегося положения, а также имевшего беспримерную службу в воспитание народа, национальное самосознание и развитие политического сознания. В этом направлении рассматривается его интеллектуальная и практическая деятельность с точки зрения выбора более удобного средства выражения национальных идей - печати, пробуждения своей нации, распространения идеи национального и религиозного единства.

При этом подчеркивается вклад Гасан бека Зардаби в пробуждение национального самосознания своего народа, мобилизацию национальных мыслителей на размышления над национальными проблемами и распространение проблем нации через средства массовой информации, а также его общефилософские взгляды и мысли в направлении понимания мира.

**Ключевые слова:** национальное сознание, национальное самосознание, просвещение, наука, мысль, печать

## The role of the philosophical ideas of Hasan bey Zardabi in the formation of the national self-consciousness of Azerbaijan in the 19th century

**Rafail Ahmadli***

**Abstract.** The article deals with the socio-political situation at the beginning of the 19$^{th}$ century in Azerbaijan, the crisis situation of the people and the activities of Hasan bey Zardabi, who was looking for a way out of the situation, and also had an unparalleled service in the education of the people, national self-consciousness and the development of political consciousness. In this direction, his intellectual and practical activity is considered from the point of view of choosing a more convenient means of expressing national ideas - the press, awakening his nation, spreading the idea of national and religious unity.

At the same time, the contribution of Hasan bey Zardabi to the awakening of the national self-consciousness of his people, the mobilization of national

* Doctor of Philosophy, Professor,
Leading Researcher of the Institute of Philosophy and Sociology of ANAS; Baku, Azerbaijan
E-mail: ehmedli.rafail@mail.ru
https://orcid.org/0000-0003-0506-3353

**To cite this article:** Ahmadli, R. [2023]. The role of the philosophical ideas of Hasan bey Zardabi in the formation of the national self-consciousness of Azerbaijan in the 19$^{th}$ century. *"Metafizika" journal. 6(2),* pp.61-69.

**Article history:**
*Received: 04.04.2022*
*Accepted: 06.06.2023*

thinkers to reflect on national problems and the dissemination of the problems of the nation through the media, as well as his general philosophical views and thoughts in the direction of understanding the is emphasized.

**Keywords*:*** national consciousness, national self-consciousness, education, science, thought, press

## REFERENCES

**1.** *“Akinchi”, 1875-1877*. Full text, “Avrasiya press”, Baku, 2005.
**2.** Askerov, R. (2013). *About Izzet Rustamov's monograph “Hasan bey Zardabi”*. Modern Az website, January 2.
**3.** Hasan Bey Zardabi. (1905). *The first Turkish newspaper in Russia*. “Hayat” newspaper, December 28, No. 129.
**4.** *“Kaspi” newspaper*, January 23, 1900, No. 18.
**5.** Omarov, V. (2012). *Hasan Bey Zardabi and Azerbaijanism.* “Ses” newspaper, March 7.
**6.** Rustamov, I. (2012). Selected works. *The masterpiece of Zardabi heritage – “Akinchi”* taken from his article. Baku, 2012.